UOT: 579.2;663.252

# ÜZÜMÇÜLÜK VƏ ŞƏRABÇILIQ KOMPLEKSİNİN XÜSUSİYYƏTLƏRİ VƏ SAHƏNİN TƏNZİMLƏNMƏSİNİ ŞƏRTLƏNDİRƏN AMİLLƏR

**L.E.HACIYEVA**
**AKTN Aqrar Tədqiqatlar Mərkəzi**

Azərbaycan Respublikasında kənd təsərrüfatının əsas sahələrindən biri də üzümçülük və şərabçılıq kompleksidir. Son illərdə bu kompleksin inkişaf etdirilməsinə xüsusi diqqət yetirilməkdədir. Bununla əlaqədar çoxsaylı dövlət qərarları və proqramları fəaliyyətdədir. Sahənin inkişafına dövlət dəstəyinin artırılması da bu əsasda formalaşdırılmaqdadır.

Bununla bağlı nəticələrin səmərəliliyinin artırılması, dövlət tənzimləmə vasitələrinin düzgün seçilməsi və tətbiqi məsələləri məqalədə araşdırılır.

***Açar sözlər:*** *üzümçülük və şərabçılıq kompleksi, spesifik xüsusiyyətlər, amillər, tənzimləmə, səmərəlilik.*

Azərbaycan üzümçülük üçün əlverişli təbii-iqlim şəraitinə, habelə üzüm və onun emal məhsullarının istehsalı sahəsində tarixən zəngin istehsal təcrübəsinə malikdir.

Kənd təsərrüfatının ölkənin valyuta gəlirlərinin təmin edilməsində əhəmiyyətli rol olynaya bilməsi nəzərə alınmaqla bu sahənin ixrac potensiyalından dolğun istifadə edilməsi ilə bağlı məsələlərin həlli ön plana keçir. Həmin istiqamətdə üzümçülük və şərabçılığın inkişafı xüsusi rola malikdir.

Üzümçülük və şərabçılıq Azərbaycanın dövlət müstəqilliyi şəraitində milli iqtisadiyyat sistemində yeni inkişaf dövrünə qədəm qoymuşdur. Son dövrlərdə səmərəli, daha məhsuldar sortları istifadə etməklə yeni üzüm plantasiyalarının salınması, eyni zamanda yeni texnoloji avadanlıqların, modern texnologiyaların tətbiqi ilə şərab məhsulları istehsalının genişləndirilməsi yönümündə miqyası işlər yerinə yetirilmişdir. Bunların sayəsində, ölkəmizdə sistem transformasiyaları ilə bağlı baş vermiş iqtisadi böhran nəticəsində, üzümçülük və şərabçılıqda qərarlaşmış olan geriləmə proseslərinin qarşısı alınmışdır.

**Üzümçülük və şərabçılıq kompleksinin xüsusiyyətləri.** İqtisadi tənzimləmə geniş mənada tənzimləmə sisteminin bir vəsiləsi kimi çıxış etdiyi üçün bu sistemin xüsusiyyətlərinə nəzər salınmasına ehtiyac yaranır. Səmərəli tənzimləmə sisteminin qurulması bazar iqtisadiyyatı şəraitində aqrar-sənaye sferasının uğurlu inkişafının təmin edilməsinin mühüm şərtlərindən biridir. Çoxsaylı müsbət cəhətlərinə baxmayaraq, bazar iqtisadiyyatı bütün cəmiyyətin və hər bir vətəndaşın maraqları baxımından sosial-iqtisadi prosesləri avtomatik olaraq tənzimləmək iqtidarında deyildir (1). Aqrar-sənaye sferasında tənzimləmə sistemi iqtisadiyyatın kənd təsərrüfatı və onunla bağlı sahələrinin özəlliklərini nəzərə almaqla formalaşdırılır. Bununla yanaşı, aqrar-sənaye sferasının ayrı-ayrı sahələrinin özünəməxsus xüsusiyyətləri tənzimləmə qaydaları və mexanizmlərində fərqli cəhətləri şərtləndirmiş olur.

Qeyd edilənlər öz növbəsində, iqtisadiyyatın aqrar-sənaye sferasının bölmələri üzrə tənzimləmə məsələlərin araşdırılmasına ehtiyac doğurur. Bunların arasında həm iqtisadi və həm də sosial inkişaf məsələlərinin həlli baxımından əhəmiyyətli rol oynaya bilən üzümçülük və şərabçılıq xüsusi yer tutur.

Üzümçülük və şərabçılıq bu sahənin tənzimlənməsində müəyyən xüsusiyyətlərin şərtləndirən cəhətlərə malikdir:

- üzümçülük kənd təsərrüfatının yüksək investisiya tutumlu sahəsinə aiddir. Bu sahədə aqroampelosenozuri yaradılması (plantasiyaların salınması, dayaq-şpaler konstruksiyalarının yaradılması, üzümlüklərə bar verən yaşa qədər qulluq edilməsi) böyük həcmli vəsait tələb edir;
- üzümçülük və şərabçılıq ümumi iqtisadi inkişaf vasitəsi kimi xeyli geniş potensiala malikdir, o cümlədən yeni iş yerlərinin yaradılmasında əhəmiyyətli rol oynaya bilir. Bu potensialdan dolğun istifadəyə təminatlar yaradılmalıdır;
- son məhsul çeşidlərinin böyük bir qismi üçün istehsal müddətinin uzunluğu (bəzi hallarda bir neçə illik dövrü əhatə etməklə) və fasiləliyi səciyyəvidir;
- üzümçülük kənar təsirlərə, xəstəliklərə və zərərvericilərə qarşı çox həssasdır və xüsusi qorunmaya ehtiyac yaranır;
- şərabçılıqda son məhsulun keyfıyyəti, orqanoleptik və fiziki-kimyəvi göstəriciləri xammalın sortundan, yetişdiyi regiondan, torpaq şəraiti, relyef kimi amillərdən sıx surətdə asılıdır və bu istiqamətdə proseslərin xüsusi idarəetməyə ehtiyacı vardır;
- üzümçülük və şərabçılıq məhsulları qida və içki olaraq insan sağlamlığına bilavasitə və ciddi surətdə təsir göstərdikləri, bununla yanaşı şərabçılıq məhsulun saxtalaşdırılması imkanları nisbətən geniş olduğu üçün həmin sahədə istehsala tənzimləmə və

intitusional vasitələrlə nəzarətin həyata keçirilməsi qaçılmaz zərurətə çevrilir;

- şərabçılıq üçün həm innovasiyalara və həm də ənənələrin qorunub saxlanılmasına həssaslıq səciyyəvidir. Bunların uzlaşdırılması bir sıra hallarda inkişafın təmin edilməsinin şərti kimi çıxış edir;
- sahədə istehsalçıların, satıcıların və istehlakçıların nüfuz mənafeləri əhəmiyyətli təsir gücünə malikdir və bu amilin nəzərə alınmaması ciddi nəticələrə səbəb ola bilir.

Göründüyü kimi, üzümçülük və şərabçılıq aqrar-sənaye sferasının bir sektoru olaraq çoxtərəfli xüsusiyyətlərə malikdir. Bu xüsusiyyətlər texnoloji, iqtisadi, ekoloji sosial, mədəni, mənəvi, tarıxı səciyyəli amillərlə bağlıdır. Bunların kompleks şəklində nəzərə alınması tənzimləmənin xüsusi tələblərə uyğun qurulması əsasında mümkün ola bilir. Daha doğrusu, üzümçülük və şərabçılıq sahələrinin tənzimlənməsinə digər sahələrdən fərqli cəhətləri olan, özəl xüsusiyyətlərə malik tənzimləmə mexanizmlərinin formalaşdırılmasına ehtiyac yaranır.

Qeyd edilən mexanizmlərin üzümçülüyün və şərabçılığın istehsal sahələri kimi yuxarıda göstərilən cəhətlərini, habelə müasir dünyada üzüm şərabına ərzaq məhsulu kimi yanaşılması meyli formalaşdığını nəzərə almaqla, digər alkoqollu içkilərin istehsalı və dövriyyəsinin tənzimləyən mexanizmlərdən əhəmiyyətli surətdə fərqləndirilməsi zəruri olur. İnkişaf etmiş üzümçülük və şərabçılıq sektoruna və geniş tənzimləmə təcrübəsinə malik olan ölkələrdə müasir şəraitdə proseslərin bu istiqamətdə inkişafı müşahidə edilir.

Üzümçülük və şərabçılığın tənzimlənməsi mexanizmləri əhatə dairəsinə görə bir neçə sahəyə aid olan vasitələri özündə birləşdirir. Bunların tərkibinə kənd təsərrüfatının, ərzaq məhsulları istehsalının, habelə alkoqollu içkilərin istehsalı və dövriyyəsinin tənzimlənməsi daxil edilir. Daha doğrusu, əgər üzümçülük və şərabçılığın tənzimlənməsi mexanizminə vahid bir tam kimi baxsaq onun, qeyd edilən sahələrin tənzimləmə mexanizmləri ilə kəsişən bölmələrdən təşkil olunduğunu demək mümkündür.

İqtisadiyyatı tənzimləmə sisteminə sistemli yanaşmanın müasir təcrübəsi baxımından yanaşıldıqda, üzümçülük və şərabçılığın özəlliklərinin ilk növbədə tənzimləmənin xarakteri, hədəfləri və mexanizmlərinin xüsusiyyətlərində ifadə olunan tərəflərinə diqqət yetirilməsi məsələləri ön plana keçir.

**Üzümçülük və şərabçılıq kompleksinin tənzimləmə prinsipləri.** Tənzimləmənin xarakteri baxımından hər şeydən əvvəl, onun sosial-iqtisadi sistemin müxtəlif pillələrini əhatə edən çoxməqsədliliyi nəzərə alınmalıdır. Üzümçülük və şərabçılıqda tənzimləmə bu sahədə fəaliyyətin stimullaşdırılması, istehlakçıların mənafelərinin təmin edilməsi, milli iqtisadi, mədəni, nüfuz mənafelərinin qorunması kimi müxtəlif istiqamətli və pilləli məqsədlərə yönəlir. Eyni zamanda üzümçülük və şərabçılıqda son məhsulun istehsalı və istehlakçıya çatdırılması kompleksində ayrı-ayrı vəsilələrin (üzümlüklər üçün əkin materialının yetişdirilməsi, üzümlüklərin salınması və bar verən yaşa çatdırılması, üzüm istehsalı, şərabçılıq məhsullarının istehsalı və qablaşdırılması, şərabçılıq məhsullarının dövriyyəsi) hər birinə tənzimləmə təsiri və belə təsirin nəticələri arasında asılılıqlar mürəkkəb və qeyri-xətti xarakter daşıyır və bu, həmin sahənin vəziyyətini səciyyələndirən bir sıra parametrlərin dəyişilməsində multiplikasiya effektinin mövcudluğu ilə əlaqədardır (2). Göstərilən cəhətlər üzümçülük və şərabçılıqda tənzimləmə sisteminin çoxşaxəli strukturunun formalaşmasını şərtləndirmiş olur.

Üzümçülük və şərabçılığın xüsusiyyətlərinə uyğun olaraq tənzimləmənin digər xarakterik cəhəti onun müxtəlif formalarının sıx əlaqəli və qarşılıqlı tamamlama səciyyəsində olmasıdır. Əslində üzümçülük və şərabçılığın tənzimləmə sistemi özündə hər biri ayrıca alt sistem kimi baxıla biləcək iqtisadi, hüquqi, inzibati və texniki formaları və vasitələri əhatə edən qarşılıqlı əlaqəli tədbirlər kompleksini (bu halda müxtəlif tənzimləmə formalarının qovşağında mövqe tutan vasitələrin mövcud olduğu da nəzərə alınır) əhatə edir (3). (1-ci diaqram).

İqtisadi tənzimləmə üzümçülük və şərabçılığın inkişafına iqtisadi alətlərin vasitəsilə müstəqim və dolayı üsullarla təsir göstərilməsi qaydasında reallaşdırılır.




**Diaqram 1. Üzümçülük və şərabçılıqda tənzimləmə sisteminin vəsilələri**

Üzümçülük və şərabçılığın hüquqi tənzimlənməsi bu sahədə qanunvericilik normaları və qaydalarının yaradılmasına yönəldilir. Müvafıq tənzimləmə vasitələri sahədə zəruri hüquqi infrastrukturun yaradılmasını təmin etməlidir. Bu tənzimləmə forması sahənin inkişafı üzrə iqtisadi qərarların qəbulu üçün hüquqi əsasların formalaşdırılmasını təmin edir.

Üzümçülük və şərabçılıqda inzibati tənzimləmə sahədə müvafıq istiqamətlər üzrə nəzarətin həyata keçirilməsi, lisenziyalaşdırma, tarif kvotalaşdırmasının müəyyən edilməsi kimi tədbirləri əhatə edir. Həmin tədbirlər idarəetmə və nəzarət qurumları tərəfindən müvafıq normalar və qaydalar əsasında reallaşdırılır. Bunlar iqtisadi maraqlara və stimullarla

bilavasitə bağlı olmurlar və tənzimləyici orqanın gücü və nüfuzuna əsaslanırlar. İnzibati tənzimləmə özündə qadağanedici, icazəverici və təhrikedici tədbirləri birləşdirir.

Üzümçülük və şərabçılıq sahəsində hüquqi və inzibati tənzimləmə tədbirlərinin əhəmiyyətli qismi bu sahədə texniki tənzimlənin reallaşdırılmasına yönəldilir.

Texniki tənzimləmə şərabçılıq məhsullarının təhlükəsizliyinin təmin edilməsi, rəqabət qabiliyyətliliyinin yüksəldilməsi, məhsul istehlakçılarının mənafelərinin qorunmasında mühüm rola malikdir.

Hazırda texniki təmzimləmənin ümumi tənzimləmə sistemində yeri, və strukturuna elmi ədəbiyyatda və qanunvericilik praktikasında vahid yanaşma mövcud deyildir. Bəzi hallarda texniki tənzimləməyə müvafıq istiqamət üzrə hüquqi tənzimləmə kimi baxılır (4). Bununla belə nəzərə almaq lazımdır ki, əslində texniki tənzimləmə təkcə hüquqi deyil, həm də inzibati tənzimləmə elementlərini əhatə edir.

Texniki tənzimləmənin şərabçılıq sahəsi üçün xüsusi önəm daşımaqla, xammal istehsalından tutmuş, son məhsulun istehlakçıya çatdırılmasınadək olan prosesləri əhatə edir. Bunlara üzümün becərilmə qaydalarına, tətbiq olunan istehsal texnologiyaya, məhsulun toplanılmasına tələblərin müəyyən edilməsi, şərab məhsullarının istehsal, saxlanma, qablaşdırma, etiketləşdirmə, daşınma və satış qaydalarının və şərtlərinin müvafıq standartlar və təlimatlar əsasında nizamlanması, habelə şərabçılıq məhsullarının keyfiyyət göstəricilərinin müvafiq tələblərə uyğunluğunun dəyərləndirilməsi üzrə sertifikartlaşdırmanın həyata keçirilməsi aid edilir.

Üzümçülük və şərabçılıq üçün həmçinin tənzimləmənin incəliyi xarakterikdir. Şərabçılıq məhsullarının keyfiyyəti, orqanoleptik göstəricilərinin xammalın sortundan, yetişdiyi regiondan, toplanılma müddəti və şəraiti, torpaq şəraiti, relyef kimi amillərdə yüksək həssaslığı ilə əlaqədar müvafıq istiqamətdə əlverişli nəticələrə nail olunması tənzimləmə üçün qəbul edilən parametrlərin fərqli qəbul edilməsi şərtlərinə əməl etməklə mümkün olur. Bununla əlaqədar, bu sahədə çoxsaylı yanaşmalar meydana gəlir.

Üzümçülük və şərabçılığın xarakterik cəhətləri öz növbəsində tənzimlənmənin əsas hədəflərinin müəyyən edilməsində və onlara yönəlik mexanizmlərin xüsusiyyətlərində öz əksini tapır. Sahənin xüsusiyyətləri tənzimləmənin aşağıdakı əsas hədəflərə yönəldilməsi zəruriliyini şərtləndirir:

1. Sahənin potensiyalının reallaşdırılması; Üzümçülük və şərabçılığın ölkələrin iqtisadiyyat sistemində xüsusi rol oynaya bilməsi, habelə üzümçülüyün kənd təsərrüfatının yüksək investisiya tutumlu sahəsinə aid olması ilə əlaqədar, bu sektorun istehsal potensiyalından istifadənin tənzimlənməsinə ehtiyac yaranır.

İnkişaf etmiş üzümçülük və şərabçılıq sektorunun mövcud olduğu şəraitdə isə sektorun potensiyalından istifadənin tənzimlənməsinin şərabçılıq məhsullarının tələb və təklifinin daha yaxşı nisbətinə nail olmaq məqsədinin həyata keçirilməsinə yönəldilməsi zəruriliyi meydana çıxır. Qeyd edilən şəraitin mövcud olduğu Avropa Birliyinə üzv bir sıra ölkələr üçün belə tənzimləmə üzümlüklərin restukturizasiyası və konversiyası qaydalarının müəyyən edilməsi formasında reallaşdırılır. Üzümlüklərin restukturizasiyası və konversiyası sistemi istehsalın bazarın tələbatlarına uyğunlaşmasını təmin edir. Həmin sistem çərçivəsində istehsal potensiyalının tənzimlənməsi aşağıdakı istiqamətlər üzrə həyata keçirilir:

-Yeni üzümlüklərin salınması; Yeni üzüm plantasiyalarını salınmasına ancaq o halda icazə verilir ki, həmin plantasiyalar yüksək keyfıyyətli şərabların və ya coğrafı göstəriciləri olan süfrə şərablarının istehsalını təmin etmiş olsun. Eyni zamanda, həmin məhsul növlərinin regionda istehsal həcmi tələbə nisbətən xeyli aşağı olmalıdır. Göstərilən tələbələrə əməl edilməsinə səmərəli nəzarəti təmin etmək məqsədilə şərab istehsalı üçün istifadə oluna bilən üzüm sortlarının təsnifatının əks olunduğu və daim yeniləşən xüsusi reyestr (5) aparılır. Müəyyən sortun reyestrdən çıxarıldığı halda onun yetişdirildiyi üzümlüklər 15 il ərzində sökülməlidir.

- Üzümlüklərin yenidən salınması; Üzümlüklər faydalı istifadə müddətini və ya xidmət müddətini başa vurduğu hallarda onların yenidən salınmasına müəyyən şərtlərlə icazə verilir. Əvvəla, həmin plantasiyada "istehsal potensiyalı" reyestrinə daxil edilmiş üzüm sortları yetişdirilməlidir.

- Aşağı məhsuldarlıqlı və ya yüksək keyfıyyətli şərabçılıq məhsulları istehsalı üçün yararlı olmayan üzümlüklərin sökülməsi; Xüsusi proqramlar əsasında həyata keçirilən bu proses bir tərəfdən yüksək keyfıyyət xarakteristikalarına malik olan son məhsullar istehsalının genişləndirilməsinə, digər tərəfdən isə ümumiyyətlə şərab istehsalının optimal həcmlərinin təmin olunmasına əlverişli şərait yaradılmasına yönəldilmişdir. Bu halda ləğv edilən üzümlüklərin hər hektarına görə onların real məhsuldarlığı nəzərə alınmaqla ödənişlər tətbiq olunur.

2. Son məhsulların qida olaraq təhlükəsizliyi və təmizliyinin təmin olunması; Artıq qeyd edildiyi kimi, şərabçılıq məhsulları insanlar tərəfındən qida kimi istehlak olunur. Digər tərəfdən, həmin məhsulların orqanoleptik xassələrini yaxşılaşdırmaq məqsədilə onlara müxtəlif qatqıların əlavə edilməsi imkanları mövcuddur. Bu qatqılar bütün hallarda insan orqanizminin sağlamlığına zərər yetirə bilirlər.

Qeyd edilənlərlə əlaqədar olaraq, şərabçılıq məhsullarının təhlükəsizliyi, yəni onların insan həyatı və sağlamlığı üçün təhlükəli olmamasına zəmanət

verən müvafiq norma, qayda və tələblərə uyğunluğunun və təmizliyinin bu sahədə tənzimləmənin əsas hədəflərindən birinə çevrilməsinə ehtiyac yaranır. Bu yönümdə həm birbaşa məhsulun tərkibinin xüsusi normalar (ayrı-ayrı elementlərin yol verilə bilən hədlərinin qoyulması şəkilində) müəyyən edilməsi və həm də istehsalın gedişində təhlükəsiz və təmizliyin təmin edilməsi üçün zəminlərin formalaşdırılmasına yönəldilmiş tənzimləmə tədbirlərin həyata keçirilməsindən istifadə edilir.

Birinci istiqamət üzrə tənzimləmə üzüm şirəsinin və şərabın emalı (işlənilməsi) üçün istifadə edilən maddələr, o cümlədən şərabda dəyişilmiş və ya dəyişilməmiş şəkildə qala bilən qatqılar və onların miqdar payının qanunvericiliklə müəyyən edilməsi formasında aparılır.

İkinci istiqamət üzrə isə tənzimləmə şərabçılıq məhsullarının istehsalı, qablaşdırılması və saxlanılması şərtlərinin müəyyən edilməsi formasında həyata keçirilir. Şərabçılıq məhsullarının istehsal şəraiti zəruri sanitariya normaları və qaydalarına uyğun olmalıdır. Bununla yanaşı məhsulun təmizliyi və təhlükəsizliyinə zəminlərin yaradılması məqsədilə şərabçılıq məhsullarının istehsalında istifadə edilən avadanlıqlara da xüsusi tələblər müəyyənləşdirilir.

Ümumiyyətlə, şərabçılıqda lisenziyalaşdırma bu sahənin məhsulunun alkoqollu içkilərin sırasına daxil olması ilə bağlıdır. Məlumdur ki, alkoqol bazarı sosial əhəmiyyətinə görə ölkələrin çoxunda xüsusi mövqe tutur. Bu bazar milli mənafelər baxımından yüksək riskli hesab edilir. Bununla əlaqədar bir çox ölkələrdə həmin sahədə sosial cəhətdən məsuliyyətli qanunvericilik qəbul olunmaqla, o cümlədən lisenziyalaşdırmanın tətbiqi vasitəsilə alkoqolun zərərli təsirinin mümkün olduğu qədər azaldılmasına çalışılır.

3. Son məhsullarının istehlakçı tələblərinə uyğun çeşidinin və keyfiyyət göstəricilərinin təmin edilməsi; Tənzimləmədə bu hədəf ilk növbədə şərabçılıqda son məhsulun keyfiyyəti, orqanoleptik və fiziki-kimyəvi göstəriciləri xammalın sortundan, yetişdiyi regiondan, torpaq şəraiti, relyef kimi amillərdən sıx surətdə asılılığı, habelə şərabçılığın innovasiyalara və ənənələrə həssas olması xüsusiyyətləri ilə bağlıdır.

**Nəticə.** Şərabçılığın tənzimlənməsinin dünya praktikasında şərabların təsnifatı bir sira meyarlar, o cümlədən sort tərkibinə, rənginə, tətbiq olunan istehsal texnologiyasına, şirinlik və ya turşuluq dərəcəsinə, dincə qoyulma müddətinə görə aparılır. Təsnifat meyarlarının tərkibi ölkələr üzrə fərqlənir. Eyni zamanda, demək olar ki bütün hallarda keyfiyyət üzrə təsnifata xüsusi diqqət yetirilir.

Şərabın içki olaraq əsas keyfıyyət parametrlərinin müəyyən edilməsində onun hazırlandığı üzüm sortunun həlledici rol oynaması, bu amilin keyfiyyət əlaməti üzrə əmtəə təsnifatının əsas meyarı kimi qəbul olunmasının məqsədəuyğunluğunu şərtləndirir. Eyni zamanda, üzümün xammal olaraq keyfıyyətinə iqlim və torpaq şəraitinin əhəmiyyətli təsir göstərməsi nəzərə alınaraq, hər bir sortun yetişdirildiyi məkanın təsbit edilməsi zəruriliyi meydana gəlir. Bu halda məhsulun keyfıyyətinə məhdud arealda torpağın və relyefın də təsir göstərə bilməsi təsnifat meyarının müəyyən bir üzümçülük zonası daxilində mikrizonalar miqyasında baxılmasını da məqsədəuyğun edir.

Şərabçılıqda xammal yetişdirilməsi və şərab istehsalının məkanının təsbit edilməsi və ona nəzarət edilməsi şərabın təbii olmasına təminatın təşkilatı-hüquqi mexanizmi olmaqla yanaşı, onun keyfıyyətinin təmin edilməsi və istehlakçıların hüquqlarının qorunması vasitəsidir.

Tənzimləmə praktikasında şərabların istehsal məkanına görə eyniləşdirilməsi qaydası müəyyən edilərkən coğrafı işarələr barədə Ümumdünya Ticarət Təşkilatının (ÜTT-nin) "Əqli mülkiyyət hüququnun ticari aspektləri barədə Sazişi"ndə müəyyən edilmiş anlayışa istinad edilir. Həmin Sazişə uyğun olaraq, coğrafı işarə təşkilata üzv ölkənin əmtəənin keyfiyyəti, nüfuzu və digər səciyyələri əhəmiyyətli dərəcədə onun coğrafı mənşəyi ilə əlaqələndirilən ərazisindən və ya bu ərazinin bölgəsi və yaxud da müəyyən yerindən olan əmtəə kimi eyniləşdirən işarədir. Əmtəələrin mənşə göstəriciləri olaraq coğrafı işarələr əqli mülkiyyət hüququna aid edilir və qorunur. ÜTT-nin qeyd edilən sazişində şərablar üçün mənşə göstəricilərinin qorunmasi üçün xüsusi qaydalar də nəzərdə tutulmuşdur.

Üzümçülük və şərabçılıq sahəsində ənənələrin və digər amillərin təsirilə şərabların istehsal mənşəyinə görə eyniləşdirilməsinə fərqli yanaşmalar formalaşmışdır. Bunları xarakterinə görə 3 formaya aid etmək olar:

- Birinciyə sərt tənzimləmə forması aiddir. Bu halda xammalın istehsalı və emalına dair ciddi tələblər qoyulur və onlara əməl edilməsinə daimi nəzarət təşkil olunur;
- İkinci tənzimləmə forması nisbətən yumşaqdır. O, istehsal mənşəyinə görə şərabların vaxtaşırı attestasiyadan keçirilməsini nəzərdə tutur. Bu halda istehsal mənşəyinə görə adlar verilən şərabları istehsal edən müəssisələrə məhsulun attestasiyasına dair müvafıq sənəd verilir. Azərbaycan Respublikasında da belə tənzimləmə forması tətbiq olunur. Üzümçülük və şərabçılıq haqqında Azərbaycan Respublikasının Qanununa uyğun olaraq istehsal mənşəyinə görə adlar verilən şərabların attestasiyasının müddəti 5 ildir. Bu müddət qurtardıqdan sonra məhsulun attestasiyası yenidən aparılır;
- Üçüncü forma isə şərabın istehsal mənşəyinə görə eyniləşdirilməsinə dair tələb ancaq onun eyni üzüm sortundan hazırlanması və etiketdə onun yetişdirildiyi region və ya regionlar barədə məlumatın

əks etdirilməsi ilə məhdudlaşır. Belə qayda Avstraliya üçün səciyyəvidir.

Müasir şəraitdə şərabçılıq məhsullarının idxalının tənzimlənməsi:

a) xaricdən gətirilən məhsulların istehlakçılar üçün təhlükəsizliyinin təmin edilməsinə;

b) daxili şərab məhsulları bazarının nizamlanasına;

c) fiskal funksiyanın səmərəli reallaşdırılmasına yönəldilir.

Qeyd edilən birinci istiqamət əsasən texniki tənzimləmə vasitələri, ikinci və üçüncü istiqamətlər isə, üstün olaraq, iqtisadi vasitələrin tətbiqi ilə həyata keçirilir. İkinci istiqamət üzrə tənzimləmə şərabçılıq məhsullarının istehsalçısı olan ölkələr üçün vacib rola malik olur.

Qloballaşmanın dərinləşdiyi şəraitdə şərabların xarıcı bazarlarda rəqabət qabiliyyətinin yüksəldilməsi ilə bağlı tənzimləmə tədbirləri əsasən məhsulun müvafıq beynəlxalq tələblərə uyğun yüksək keyfıyyət göstəricilərinin təmin edilməsinə yönəldilir. Bu istiqamətdə texniki tənzimləmə vasitələri (standartlaşdırma, ekspertizaların keçirilməsi tələbləri, sertifıkatlaşdırma ) aparıcı rol oynayır. Adətən həmin vasitələrin tətbiqi ilə tənzimləmə tədbirləri paralel surətdə aparılmaqla ixraca yönəldilən məhsulun keyfıyyətinin dəqiqləşdirilmiş təsdiqinə təminat yaradır. Daha sərt tənzimləmə variantının tətbiq olunduğu hallarda şərabçılıq məhsullarının ixracı üçün ayrıca lisenziyaların alınması tələbi də qoyulur.

Şərabçılıq məhsullarının xarici bazarlarda yüksək rəqabət qabiliyyətinin təmin olunmasında iqtisadi vasitələr ayrı-ayrı hallarda ixrac potensiyalı olan məhsulların xarici bazara çıxışını genişləndirməyə yönəldilən məhsul növləri üzrə məqsədli vergi güzəştlərinin tətbiqi və ya ixracın stimullaşdırılması proqramları çərçivəsində maliyyə köməyi tədbirləri vasitəsilə də həyata keçirilir. Belə hallarda iqtisadi vasitələr şərabçılıq məhsullarının xarici bazarlarda qiymət rəqabətinə davamlılığının yüksəlməsinə imkan verir.

Göründüyü kimi, üzümçülük və şərabçılıq sahəsində tənzimləmə sistemi çoxistiqamətli və çoxelementli olmaqla kifayət qədər mürəkkəb struktura malikdir. Həmin sistemdə ayrı-ayrı tənzimləmə formalarının yeri və rolu konkret tənzimləmə predmetinə və ölkələr üzrə tətbiq olunan tənzimləmə qaydalarının xüsusiyyətləri ilə müəyyən olunur.

**ƏDƏBİYYAT**

1. Abasov İ.D. Aqrar sahənin inkişaf strategiyası. Azərbaycan Aqrar Elmi jurnalı 2005 (1-2) s. 4-9. 2. Abbasov T.A. Aqrar sahənin inkişafının iqtisadi konsepsiyası/Azərbaycan Elmi-Tədqiqat Kənd Təsərrüfatının İqtisadiyyatı və Təşkili İnstitutunun elmi əsərləri. 2012, №4, Bakı, s. 71-75, s. 341-342. 3. Abbasov V.H. Bazar iqtisadiyyatına keçid şəraitində emal sənayesinin inkişaf problemləri. Qafqaz Universiteti. II Beynəlxalq Konfransın materialları. Bakı, 2007. 4. Alıyev İ.H. Qloballaşma şəraitində aqrar sahənin dayanıqlı inkişafının təmin olunmasının sosial-iqtisadi problemləri. Bakı, 2008, 400 s. 5. Alıyev İ.H. Milli iqtisadiyyat və aqrar sahənin inkişaf problemləri. Bakı, 2006, 380 s.

**Особенности виноградно-винного комплекса и факторы, способствующие регулированию поля**

**Л.Э. Гаджиева**

В Азербайджанской Республике одним из основных направлений сельского хозяйства является виноградно-винный комплекс. В последние годы развитие этого комплекса стало особенно примечательным. В связи с этим имеются многочисленные правительственные решения и программы. На этой основе формируется государственная поддержка развития области.

В связи с этим в статье рассматривается эффективность полученных результатов, правильный выбор и применение способов государственного регулирования.

***Ключевые слова:*** *виноградарский и винодельческий комплекс, специфические особенности, факторы, регулирование, эффективность.*

**Characteristics of viticulture and wine-making complexes and conditional factors of field regulation**

**L.E. Hajiyeva**

One of the main branches of agriculture in the Republic of Azerbaijan is the viticulture and wine-making complex. Recently years, particular attention is paid to the development of this complex. In this regard, numerous government decisions and programs are in place. The state support for the development of the field is being formed on this basis.

In this regard, the article examines the effectiveness of the results, the proper selection and application of state regulation tools.

***Key words:*** *viticulture and wine-making complex, specific features, factors, regulation, efficiency.*